*Şənbə, 9 rəcəb 1339* **On altımcı il** *29-hut 1299*

# ملا نصرالدین

MOLLA NƏSRƏDDİN

*Şümarə 3* *Qiymətі satıcı əlində on altı şahi* №3




*Tamam e'tiqad və imanımla gəlmişəm sizin firqəyə daxil olam.*

# HƏME SALE MA ACLAR, EYLULLAH DAD!

# HƏME RUZE-MA RUZE-NOVRUZ BAD!







**Abunə qiyməti:** **Hər həftə nəşr olunur**

| | |
|---|---|
| İlliyi | 40 qran |
| Yarım illiyi | 22 qran |
| Üç aylığı | 12 qran |
| Tək nüsxəsi satıcı əlində | 16 şahı |
| Əcnəbi məmləkətlərə illiyi | 60 qran |

**Məhəlli-İdarə:**
Təbriz, bazari–usta şagird, xanəyi–şahzadə Nüsrətüssəltənə

Teleqraf və post ünvanı: Təbriz, "Molla Nəsrəddin"

## MÜBARƏK OLSUN

Adət eləmişik bayramda sevinmək, şad olmaq və bir-birimizi təbrik etmək. Uşaqlar da adət edib bayramda sevinmək, şad olmaq və bir-birini təbrik etmək.

Bəs təfavüt nədir? Uşaqlarla bizim təfavütümüz hardadır? Uşaqlar da şad olub, biz böyüklər də şad olmuşuq. Uşaqlar sevinib təzə paltar və qırmızı yumurtaya, biz böyüklər də elə haman şeyə sevinmişik. Amma lazımdır ki, biz böyüklərlə kiçiklərin təfavütü ola idi. Təfavüt də burada ola bilər ki, bayram günü biz təzə geyinmiş, cibləri dolu uşaqlarımıza baxanda sahibsiz, ac uşaqları da yada salaydıq ki, bayram günü bizim uşaqlarımız plov yeyəndə yetimə uşaqlar bəlkə yavan çörək də tapmayacaqlar.

Bir kəs ki, bu mətləbi düşünmədi, onun uşaqdan bir fərqi yoxdu, çünki uşaq tayfası belə hisslərdən uzaq olar.

Amma həqiqi bayram o kəslər üçündür ki, bayram günü onun cismindən savayı ruhu da şad ola, ruhun da şadlığı o surətdə ola bilər ki, insanlar insanlıq vəzifəsini yerinə yetirə.

Mübarək olsun eydi-səidi-novruz o şəxslərə ki, bayram münasibəti ilə sahibsiz bir uşağı yada salıb onu şad edəcək. Mübarək olsun eydi-firuzi-novruz o qardaşlara ki, onun hümməti nəticəsində digər bir möhtac qardaşımız da bayram günü özü və uşağını tox görüb, uşağını bir qırmızı yumurta ilə sevindirə biləcəkdir.

*Molla Nəsrəddin*

# ƏDƏBİYYAT

*Çoxdu bu növ kimsələr,*
*Gər sənə baxsa bir gözü,*
*Yerləri hər məkandadır.*
*Bir gözü özgə yandadır.*

*İndi ki, söz düşüb deyim*
*Bir gözü sol tərəfdədir,*
*Bir para firqəbazdan.*
*Bir gözü bəydə, xandadır.*

*Bir belə şəxs bənzəyir*
*Bir gözü öz payındadır,*
*Çox gözü dar bir aca,*
*Bir gözü də qazandadır.*

*Çox həzərati yoxladım*
*Bir gözü doğruya baxır,*
*Əksəri lax çıxdılar,*
*Bir gözü də yalandadır.*

*Xeyli cəsarət əhlidir*
*Bir danışanda diksinir,*
*Ortalığa düşənləri,*
*Bir gözü də ajandadır.*

*Kəsmə ümid, yoldaşım,*
*Bir gözü qəbri axtarır,*
*Düşmənin ömrü az qalıb,*
*Bir gözü bu cahandadır.*

*Vay ola kim o kəslərə*
*Vay ola əyri yollara,*
*Fikri nə iştibah edə,*
*Rah tutub, azandadır.*

*İmza: Kabla Haxverdi*

# VƏTƏN XADİMLƏRİ

**Dibaçeyi-kitab**

Bir gün nəzmiyyə qabağından keçirdim, gördüm orada bazar əhlindən bir böyük yığıncaq var. Soruşdum:

-Bu nə camaatdı?

Bir kəs cavab vermədi. Amma tanışlarımdan bir nəfər qulağıma pıçıldadı ki:

-Durma, gəl gedək, bu cəmaatın hamısı təminat müfəttişləridir ki, yığışıblar məvacib almağa.

Mən o gün elə xəyal elədim ki, dostum mənimlə zarafat eləyir.

Xülasə...

**Bəli, keçək söhbətə**

Təqlili-məxaric babətindən, necə ki, keçən şümarədə ərz olunmuşdu, maliyyə idarəsindən sora növbət nəzmiyyəyə yetişəcəkdir və bu barədə belə qərar qoyulub:

Əvvələn, savayı ondan ki, təzə rəisi-nəzmiyyə özü təzəlikdə tə'yin olunanda hüququnun nisfinə iktifa edib qalan müavin və kəfillər də buna bir növ təbəiyyət ediblər. Amma nəzmiyyənin qeyri qulluqçuları barəsində belə binagüzarlıq olunub.

MƏN DİLXOŞLUQ VƏ SƏADƏTDƏ BAYRAM ELƏYİRƏM,
AMMA HEYF Kİ, BİR MÖHTAC ADAM ŞƏHƏRİMİZDƏ
TAPMADIM Kİ, ONA ƏL TUTAM

Mə'lumdur kı, komıssarlardan və ajanlardan başqa idareyi-Nəzmiyyədə min üç yüz yetmiş mə'mur var ki, bunlar əsnaf və unifrom libasında tə'minat müfəttişi adı ilə vətənə xidmət edirlər. Hələ bunlardan savayı genə çox-çox bimənsəb sahibmənsəbləri demirəm ha...

Bəli, bu qism vətən xadimləri min üç yüz yetmiş nəfərdir. Amma həqiqətə baxsan, bunların sayını və hesabını Allahdan başqa heç kəs bilməz, çünki bunların hər birini şəhərin bir sahibnüfuzu öz yanınca gətirib ki, ona bir mə'-muriyyət verilsin və bunların da mə'muriyyəti budur ki, çıxıb bazarı və küçələri gəzib qoymasınlar ki, şəhərdə zəlzələ olsun. Bunların hüququ maliyyədən çatasıdır. Maliyyə də bunlara həvalə verir ki, kənd ərbablarının bədhəqlərindən, yainki bişüurlarından tapsınlar və məvaciblərini onlardan alsınlar.

Elə ki, ortalığa bir az pul gəldi, həmin min üç yüz yetmiş nəfər doluşurlar Nəzmiyyəyə və bir-birini itələyə-itələyə pulu qismət eləyirlər.

O ki, qaldı Nəzmiyyə müdirləri, komissarlar və postlarda duran məvacibsiz ajanlar, onlar da Hacı Nəcmüddövlənin təqvimini mülahizə eləyib Allah-taalanın dərgahına min-min şükürlər eləyirlər. Çün təqvimdə yazılıb: "in mah dəlalət mikonəd bə flan və flan və səbr və təhəmmülirəncbəran və çörəyi zəhmətlə qazanan, nəinki bə boş-boş dolanan".

*Molla Nəsrəddin*

## TƏBRİZDƏ ƏHDÜ PEYMAN

Bəzzazun andı: Bu çitin arşını dörd qrana mayadı, sənə üç qrana verirux, yalan deyənin arvadını.......... (dükan da doludu arvadnan).

Baqqalun andı: Əgər bu gün pəniri sizə yetirməsəm urusun ....................mənimsaqqalıma.

Qəssabun andı: Ağa ərkəkdi, yalan deyənin anasına........................olsun.

Əttarun andı: Əgər bu çay o çaydan olsa, yezidə gələn lə'nət mənim ............... gəlsin.

Çörəkçinun andı: Ağa xassə və düatəşədi, belə olmasa................. mənim ağzıma.

Bir əllafun andı: Qaradağ kömüründən başqa sizə kömür göndərənin yeddi arxasunu.........................

Başmaqçınun andı: Ağa, altı da göndür, üzü də. Yalan ərz eləsəm ca.........................m.

Saətsazun andı: Bir dolanun, gəlün, saatuvuzu aparun, bu dəfə də hazır eləməsəm nu... ......... ... ... ...... ...... əskikəm.

Dərzinun andı: Ağa, vallah, yalqız ütüsü qalır, bazara bir baxun, qayudun, qurtarub verməsəm bu bazar əhlinım........................ mənim goruna.

Dəmirçinun andı: Əmi, qorxma, bu orax xalis Ərzrum poladındandı, yalan deyən sənün................olsun.

Mədrəsə uşağının andı: Yalan deyənun bacısı......................əgər bu kitab məndədi.

Bir xanun andı: Sizin başuvuz üçün, yalan deyən qu........................saxdı, quzuplovu bu cümə axşamı verəcağam.

*İmza: Utanmaz kətdi*

## E'LANIN ZƏRƏRI

"Təkamül" ruznaməsi hər nömrəsində xəbər verir ki, bir kəs istəsə ruznamədə e'lan çap elətdirə, qiyməti flan qədərdir. Mən elə qanıram bu sözləri ruznamədə yazmağm mə'nası yoxdur.

SƏN ACLARDAN DƏM VURURSAN, AMMA GƏL
MƏNİM BAYRAM CƏLALIMA TAMAŞA ELƏ.

Səbəb budur ki, xalq dəli deyil ki, öz əlilə özünə ziyan vursun və hələ idarəyə pul da versin.

Elanın zərəri budur ki, məsələn, biri elan etdirəcək ki, məsələn, flan yerə bu qədər yaxşı içməli çay gəlib, ya flan yerdə yaxşı təzə varid olmuş xurma satıram. Bunu camaata xəbər verməyin heç bir faydası yoxdur, zərərindən savayı. Zərəri budur: əvvəla, oğrular biləcək ki, flan yerdə çay, ya xurma var. Saniyən, bir möhtac adam, ola bilər ki, gedə yalvara ki, hacı, qadan alım, o çaydan bir çimdik ver uşağıma çay dəmləyim. Salisən, burda bədnəzər məsələsi də var.

Bu səbəbdən mən möhtərəm ruznamədən xahiş edirəm bu mətalibi ruznamədə dərc etməsin, çünki İranda elanın lüzumu yoxdur.

*İmza: Hərdəmxəyal*

## QIZ TƏRBİYƏSİ

Bir məsələ var ki, onu gərək indidən düşünək ki, axırda peşimançılıq üz verməsin. Mətləb budur ki, biz görürük bu axır vaxtlar oğlanlarımız mədrəsələrə gedib təhsil tapırlar və yekəlib evlənmək fikrinə düşəndə axtarırlar ki, özlərinə elə bir ömür yoldaşı tapsınlar ki, onların səliqəsinə və zövqünə müvafiq gəlsin. Amma çünki özləri az-çox elm və tərbiyə görüblər, dəxi tərbiyə və elm görməmiş qızlarımıza mail olmurlar və çoxları gedib əcnəbi millətlərin oxumuş qızlarından bəyənib, alıb özlərinə övrət qərar verirlər.

Əgər bu iş bir qədər vaxt belə getsə, axırda bir yandan ailələrimiz milliliyini itirib millətimizdən yadırğayacaqlar, bır tərəfdən də qızlarımız yekəlib, illərlə evdə qalıb, nişanlı intizarında olacaqlar.

Və özgə cür də ola bilnıəz, çün alim cavanlarımızı qınamaq mümkün deyil, səbəb budur ki, əgər onlar gedib tərbiyəsiz qız alıb evə gətirsələr, yola getməyəcəklər və necə də yola getsinlər ki, kişi kitabdan və elmdən danışanda övrət saatda bir asqırıb deyəcək: "Kişi, tək səbir gəldi, qoy kitabı yerə". Kişi övrətdən bir burun dəsmalı istəyəndə, övrət deyəcək: "Sən Allah, kişi, özündən iş çıxartma, ətəyinnən burnuvu sil".

Bəs bunun çarəsi?

Biri budur ki, qızlara da tərbiyə verək ki, kişilərlə hər bir işdə tuş getsinlər. Amma bu məsləhət deyil, çünki xudanəkərdə qız dərs oxusa və yazmaq bilsə, bəlkə şayəd ola bilər ki, məsələn, indi bir sözdü danışırıq, kefi istədi, götürdü bir yad kişiyə bir kağız yazdı.

Amma mənə qalsa, ən səlamət çarəsi budur ki, biz heç əslindən oğlan uşaqlarını da dərsə qoymuyaq. Əgər belə olsa, nə şiş yanar, nə kabab. Onda, məsələn, səbir gələndə kişi də işini yarımçıq qoyar ki, səbir keçsin, övrət də yarımçıq qoyar.

Dəxi bundan yaxşı əlac mən bilmirəm. Və bu da hamısından məsləhətdir.

*Dəli*



O BİÇİZLƏR DƏ QUDURUBLAR Kİ,
BİZ DƏ GƏRƏK BAYRAM ELƏYƏK.
AY BALAM, SƏN ALLAH QOY GET İŞÜVƏ

# ƏDƏBİYYAT

## "D A R A N Q"

Lağlağı şairimin yadıma düşdü əsəri,
Nəzm edib təbi gələn günləri əşarında,
Kişinin fıkrinə bilməm ki, nə düşdü ruzi
Çörəyin şalına bükdü və götürdü dəyənək,
Dedi, ey gözlərimın nuru, gülüzlü oğlum,
Dərdimi mən yaraşır ki, genə canana deyim
Şəhridə vardı bir ədliyyə - ədalət bazarı,
Yeddi ildir dügünüb orda ədalət dügünüm,
Bircə ümid qalıb quyruğu tumbul quzuva,
Aparam, bəlkə verəm, alnı hənalı quzunu
Ağlama, ağlama Cəfər bala, canım, ciyərim,
Alaram çoxlu taraqqa gözü giryan balama
Onda gördüm ki, taraqqa açılıb etdi "daranq",
Müxtəsər, başladı Həzrətqulu Təbrizə yolun
Şəhrə çatdıqda bilib hardadı Səndüqülmülk
Naziri görcək o heyvan quzu birdən məlmədi,
Quzunu aldı, apardı evə fərraşbaşı,
Bəs ki tək qaldı həyətdə quzu, peydər mələylr,
Etdi təşrif çölə qeyzlə Səndüqülmülk
Kəblə Həzrətqulunu gördü durubdu qapıda,
Bir qədəm də yeriyib ta ki tüpürdü üzünə,
Dedi: ey qırmızısaqqal, hənalı çaqqal,
Edirəm əmr sənə, qaç bu dəqiqə kəndə
Get, gətür, bir-iki batman yeməli yağlı qurut
Altı-yeddi, ya da on danə toyuq, bircə xoruz,
Bir də bu tək quzuya bircə də yoldaş gətir,
Gər bu şeylər gələcəkdir mənə ver qöli-sərih,
Adilin sözlərini yaxşıca guş etdi kişi,
Əliboş həm üzü qarə yola düşdü evinə,
Dedi: ey həsrət olan bircə taraqqaya balam,
Ərşi-əlayə yetirdi məni Səndüqülmülk
Bir taraqqa mənə ədliyyədən oldu ənam,
Yaşaya min sənə ədliyyənin adil ağası
Yazılıb bilməli bir vaqeənin müxtəsəri.
Kəblə Həzrətqulu kattanı və oğlu Cəfəri.
Əzmini cəzm qılıb ta edə şəhrə səfəri.
Övrətə söz deməyib, leyk çağırdı pəsəri.
Olsun üstündə bu dünyada xudanın nəzəri.
Bəlkə şayəd qanasan bir balaca xeyri-şəri.
Taleim qismət edib orda mənə bir zərəri.
Müftə də yoxdu açan bu dügünü bir nəfəri.
Əli boş çün ora qoymulla dəxi bir bəşəri.
Ta qəbul eyləyə ədliyyə də bu dərdi-səri
Gəlmənəm ta əli boş, eylə də bilmə pədəri
Atılanda dağıla fikri, qəmi, həm kədəri.
Bilirəm ta nə qədərdir bu çağamın hünəri.
Quzuya vermədi yolda bir əziyyət xətəri.
Yetdi darvazaya, həm orda da gördü nökəri.
Heyvanın da var imiş xan qapısından həzəri.
Sədri-ədliyyəyə çatdı bu qonağın xəbəri.
Çox da müşküldü belə ah-fəğanə dözəri.
Kətdiyə can qərar etdi cəhənnəm səğəri.
Hazır olmuşdu ki, atsın ona tirü təbəri.
Başına bir yumruq vurdu, bitirdi zəfəri
Neylədin bəs quzunun yoldaşını, tək mələri?
Ləngimə müftə burada, dəxi güdmə səhəri.
Elli, bax, bunca gətür dostuva hər nə düşəri.
Bu da olsun olarun misli-çoxarvatlı əri.
Yoxsa baş - beynim aparsa, elə vurram gəbəri.
Gəlməsə bil ki, işin ta neçə il də gəzəri.
Bir cavab eyləməyə çatmadı tabü təpəri.
Görcək oğlun gözünün çeşmə kiini axdı təri.
Elə təbrik və alqışla atan bəxtəvəri.
Arizu eyləmirəm dövləti, həm simü zəri
Atılıb, sövtü "daranq" elədi hər dövrü bəri.
Kəsilə bizlərə də ədl evinin rəhgüzəri.

*İmza: Utanmaz kətdi*

HƏQİQƏT ADAM BAYRAMI ELƏ
BİR NOV ELƏYƏ Kİ, BU DİLƏNÇİLƏR ADAMIN
ƏL-AYAĞINA DOLAŞMAYA

# XƏBƏRDARLIQ

Bu günlərdə bizə mə'lum oldu ki, şəhərin ən mötəbər və dövlətməndlərindən bir nəfər Hacı və Hacızadə cənabları öz məxsusi droşkasına bir şapkalı madamasını əyləşdirib, özü ilə bərabər aparıb Aramyans teatrosuna və orada xanımın şərəfinə bir ziyafət təhiyyə edib və bu ziyafətə camaatın nəzərində bir qədri qızıl lirələr məsrəf edib.

Əlbəttə, biz bunu da iqrar edirik ki, hər bir şəxs öz cibinin və məzağının vəkilidir və şəxsin məhrəmani övsaf və amalı hər növ irad və dəxalətdən məhfuz olmalıdır. Və lakin bir nöqtə var ki, bu barədə biz söhbət açmağa məcbur oluruq.

Bunu biz görürük ki, əsrin övzaı və camaatın halı fəna bir məqamə çatıb, belə ki, hər bir qədəmdə biz hədsiz yövmiyə ruzisinə möhtac olanlara və növ-növ fələkzədələrə rast gəlirik ki, bunlara heç bir mənbədən və heç bir əşxasdan bir müavinət əli uzadılmır və hər bir surət sahibindən imdad təmənnasına düşənlərə cavab verilir ki: "pul yoxdur".

"Pul yoxdur" deyənlərə və özlərini zahirdə təmkinli saxlayanlara bir sözünüz yoxdur, amma bu qədər var ki, teatr kimi ümumgahda çörək puluna möhtac olanların nəzərində məşrubata və naməhrəm övrətlərə qızıl lirələri ovuc ilə sərf edənlər qəflət yuxusundan ayılmalıdırlar.

Bu dəfə xəbərdarlıq babətindən məzkur Hacının adını zikr eləməkdən əl saxladıq, amma bu qəbil hacılara vəsiyyət edirik ki, bundan soralıqda agah və huşyar olub bir tərəfdən bizim giley-güzarımızdan və digər tərəfdən min-minlərcə çörəyə möhtac olanların nifrətindən ehtiyat eləsilər.

*İdarədən*

**POST QUTUSU**

Təbrizdə Bahadır Nizama: — Bir vaxt lazım olar.

**"Qorxağ"a:** — "Vəsiyyət" əşaruvuz çap olunmadı.

**"Millətpərəst"** imzası ilə yazana: — Əgər qəlbivi kəsafət basıb, gəl səni aparım hamamlaruvuzun birinə ki, suyu on ildir dəyişilmir.

**"Xəstə"yə:** — Bu dəfə qaldı, amma ayrı bir şey yazuz.

**"Tiflis musurmanı"** imzası ilə yazana: — Şirin yazılıb, amma məsələni təkrar eləmək istəmədik.

**"Şaxta vurmuş üzüm"ə:** — Pis deyil, amma elə bilirəm ki, tezlikdə növbə çatmaya. Özgə bir şey müxtəsər surətdə yaz.

**"Dəllalbaşı"ya:** — Mədaxile-həlal elanları çap olunacaq.

**Bağıra:** — Pis deyil, heyf ki, uzundur. Bəlkə lazım ola.

**"İxlaskeş"ə:** — Bir kəs dörd divar içində gördüyü iş həman yerdə qalmalıdır.

**"Taqtaq"a:** — Əşarınız çap olunacaq.

**Ağa Məhəmməd Baqqala:** — Uşağuvuzun faciəsi barəsində söhbət açanq.

**"Sarsaqqulu"ya:** — İt ayaqlamış soğan kərdisini oxuculara göstərməyi rəva görmədim.

Mərənddə **"Qəmişqulu"ya:** — Təşəkkürümüz var, bu da lazım olar. Hər nədən yazsanız məmnun olarıq. Yoldaşınızın imzasını oxuya bilmədik.

---

Müdir və sərmühərrir: Cəlil Məmmədquluzadə

Vəkillərimiz: Təbrizdə–Dəme məqbərə, tovziye cərayed.

Bazare-şişegərxane, kitabxaneye "Pərvəriş".

Dəme hərəmxane, mətbəeye-"Hüseyni".
Daş mağazalarda: Qulu xan dərzi.

Təbriz, mətbəeye "Ümid".

*Təbrizdə bəzzaz dükanı.*

*-Xanım, buyur sən də siqar meyl elə*

**Behzad**

***-Ey kaftar, qız uşağını mədrəsəyə göndərirsən ki, yekələndən sora götürüb yad kişiyə kağız yazsın?***